## *TÖVHİD*

*Allah-təala bütün məxluqatı Ona ibadət etmək üçün yaratdı və O, məxluqların rizqlərini də verdi. Allah-təala Qur'ani-Kərimdə buyurur:*

***«Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım. Mən onlardan ruzi istəmirəm, Mən onlardan Məni yedirtmələrini də istəmirəm. Şübhəsiz ki, ruzi verən də, yenilməz qüvvət sahibi olan da Allahdır»*** *(əz-Zariyat: 56-58).*

*İnsan doğulduğu gün onun fitrəti müsəlman olur. Onun əqli tövhidlə bağlı olur. Şirk isə sonradan daxil olur. Allah-təala buyurur:*

***«Batildən haqqa tapınaraq üzünü Allahın fitri olaraq insanlara verildiyi dinə tərəf tut. Allahın dinini heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəriyyəti bilməz»*** *(ər-Rum: 30).*

*Əbu Hureyrədən (Allah ondan razı olsun!) rəvayət olunur: «Peyğəmbər (s.ə.s.) dedi: "Hər doğulan insanın fitrəti müsəlmandır. Onu sonradan ata-anası xristian, yəhudi, məcusi (atəşpərəst) edir"» (Buxari və Müslim).*

*Bəşəriyyətin əsası İslam dinində olub. Allah-təala buyurur:*

***«İnsanlar tək bir ümmət idi. Allah onlara müjdə verən xəbərdarlıq Peyğəmbərlər göndərdi…»*** *(əl-Bəqərə: 213).*

*Ən birinci şirk, səhih, düz əqidədən dönmək Nuhun qövmündə yarandı. Ona görə Nuh ən birinci peyğəmbərdir. Buna dəlil olaraq Allah-təala Qur'ani-Kərimdə buyurur:*

***«Biz Nuha və ondan sonrakı peyğəmbərlərə vəhy göndərdiyimiz kimi sənə də vəhy göndəririk»*** *(ən-Nisa: 163).*

*İbn Abbas deyir: «Adəmlə Nuhun arasında 10 əsr olub. Nuha qədər olan insanlar hamısı islamdə idilər».*

*Həmçinin İbn əl-Qeyyim deyir: «Übeyy ibn Kə'bin qiraəti, İbn Abbasın sözünə qüvvət verir. Übeyy ibn Kə'b «əl-Bəqərə» surəsinin 213-cü ayəsini belə oxuyardı:*

***«İnsanlar tək bir ümmət idi. Allah onlara müjdə verən və xəbərdarlıq edən peyğəmbərlər göndərdi, insanlar arasındakı ixtilafları ayırd etmək üçün O, peyğəmbərlərlə birlikdə haqq olan kitab nazil etdi…».***

*Bu qiraətə Qur'anın «Yunus» surəsinin 19-cu ayəsi qüvvət verir. Allah–təala buyurur:*

***«İnsanlar ancaq tək bir ümmət idilər. Sonra ayrıldılar».***

*Bu onu göstərir ki, insanlar düzgün dində idilər, yalnız ixtilafa düşdükləri üçün Allah-təala peyğəmbərlər göndərməyə başladı. Necə ki, ərəblər İbrahimin*

*dinində idilər və Əmr bin Leyh əl-Xüzai bu dini ölkəyə bütlər gətirməklə dəyişdirdi. Bu səbəbdən Allah-təala Məhəmmədi (s.ə.s.) peyğəmbər olaraq göndərdi. O da öz növbəsində insanları İbrahimin dininə, tövhidə çağırdı, bu yolda vuruşdu və insanları düzgün dinə qaytardı. Lakin buna baxmayaraq cahillikdən və ya başqa dinlərdən İslama girən bəzi şəxslər müsəlmanların yaşadıqları yerlərə şirki yaydılar. Nəticə etibarı ilə cahil, elmsiz müsəlmanlar Allaha şərik qoşmağı təvəssül (yəni Allaha yaxınlaşmaq) adlandırdılar. Lakin onlar yaddan çıxartmışlar ki, onların dedikləri söz Peyğəmbərin (s.ə.s.) dövründəki Məkkə müşriklərinin (yəni şərik qoşanların) sözüdür. Buna dəlil olaraq Allah-təala buyurur:*

***«Allahı qoyub özlərinə dost tutanlar: "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik" - deyirlər»*** *(əz–Zümər: 3).*

*İnsanların əksəriyyəti bu şirki etmələrinə baxmayaraq onlar rübubiyyət tövhidini – yəni Allahın dirildən, öldürən, yaradan, ruzi verən və s. olmasını qəbul edirlər. Onlar yalınz üluhiyyət tövhidində – yəni ibadətdə şərik qoşurlar.*

*Allah–təala buyurur:*

***«Onların əksəriyyəti Allaha ancaq şərik qoşaraq inanırlar»*** *(Yusif: 106).*

*Rübubiyyət tövhidini çox az adam inkar edir. Məsələn, Firon, mülhidlər (inkar edənlər), dəhriyyələr*

*(ateist) və kommunistlər inkar etmişlər. Bu onların zahiri görünüşüdür, amma batinlərində (yəni qəlbən) isə onlar bunu qəbul etmişlər. Necə ki, Allah-təala buyurur:*

***«Möcüzələrimizin həqiqiliyinə daxilən möhkəm əmin olduqları halda haqsız yerə və təkəbbür üzündən onları inkar etdilər»*** *(ən-Nəml: 14).*

*Onların aqilləri etiraf edir ki, hər məxluqun mütləq xaliqi (yaradanı), hər varlığın mütləq var edəni olmalıdır. Ona görə bunu inkar edən ya ağılsızlıqdan, ya təkəbbürlükdən və ya səfehlikdən edir. Ancaq onlara heç bir fikir verən belə yoxdur.*

## ***ŞİRK: Tərifi və növləri***

***Tərifi:*** *Şirk Allaha rübubiyyət və üluhiyyət tövhidində şərik qoşmaqdır. Şirkin çoxu üluhiyyət tövhidində olur.*

*Buradan belə sual ortaya çıxır:*

*- Nə üçün şirk ən böyük günahdır?*

*- Ona görə ki, bu məxluqu (yaradılmışı) Xaliqə (Yaradana) oxşatmaqdır. Yəni o ibadətlər ki, yalnız Allaha məxsusdur, bu ibadətləri başqaları üçün etmək şirk olur. Məsələn, qurban, nəzir, qorxmaq və ya başqa birini Allaha olan məhəbbətlə sevmək kimi ibadətlər. Bu isə ən böyük zülmdür. Allah-təala buyurur:*

***«…Həqiqətdən, Allaha şərik qoşmaq ən böyük zülmdür»*** *(Loğman: 13).*

*1). Ona görə ki, Allah-təala bizə xəbər verib ki, əgər qul ölsə və şirkdən tövbə etməsə, Allah onu heç vaxt bağışlamayağacaq. Allah-təala buyurur:*

***«Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlar. Allaha şərik qoşan şəxs, əlbətdə, böyük bir günah etmiş olur»*** *(ən-Nisa: 48).*

*2). Ona görə ki, Allah-təala bizə xəbər verib ki, O, şirk edən üçün cənnəti haram etmişdir və o kəs əbədi cəhənnəmlikdir. Allah-təala buyurur:*

***«…Allaha ibadət edin. Allaha şərik qoşana Allah, şübhəsiz ki, Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir. Zalimlərin heç bir köməkçisi yoxdur!»*** *(əl-Maidə: 72).*

*3). Ona görə ki, şirk bütün əməlləri batil edir. Allah-təala buyurur:*

***«…Əgər onlar şərik qoşsaydılar, etdikləri əməllər puça çıxardı»*** *(əl-Ənam: 88).*

*Allah–təala başqa bir ayədə buyurur:*

***«Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: "Əgər şərik qoşsan, bütün əməlin puça çıxacaq və mütləq ziyan çəkənlərdən olacaqsan"»*** *(əz-Zümər: 65).*

*4). Ona görə ki, şirk edənin canı və malı halaldır. Allah-təala buyurur:*

***«Haram aylar çıxınca müşrikləri harada görsəniz, öldürün, yaxalayıb əsir alın, həbs edin və bütün yollarını, keçidlərini tutun…»*** *(ət-Tövbə: 5).*

*5). Ona görə ki, şirk ən böyük günahlardan biri sayılır. Peyğəmbər (s.ə.s.) bir hədisdə əshabələrə müraciətində belə xəbər verir: «Sizə ən ən böyük*

*günah nədir xəbər verimmi?» Dedilər: «Bəli, ya Peyğəmbər». Dedi: «Allaha şərik qoşmaq və ata-anaya itaət etməmək» (əl-Buxari və Müslüm).*

*Böyük alim İbn əl-Qeyyim demişdir: «Allahın bizi xəlq etməkdə məqsədi budur ki, Onu isimləri və sifətləri ilə tanıyaq, tək Ona ibadət edək».*

*Allah-təala buyurur:*

***«And olsun ki, Biz peyğəmbərlərimizi açıq-aşkar dəlillərlə göndərdik. Biz onlarla birlikdə kitab və ədalət tərəzəsi nazil etdik ki, insanlar ədalətlə rəftar etsinlər…»** (əl-Hədid: 25).*

*Bu ayədə Allah-təala bizə xəbər verir ki, O, peyğəmbərlər yolladı, kitablar nazil etdi ki, insanlar ədalətli olsunlar. Ən böyük ədalət isə tövhiddir. Ədalətin əksi isə zülmdür. Ən böyük zülm isə şirkdir.*

***Şirkin növləri:***

***1)** Böyük şirk: Bunu edən şəxs cəhənnəmlikdir. Əgər bövbə etməzsə, Allah onu bağışlamaz. Bu şirk Allaha xas olanı başqaları üçün etməkdir. Məsələn, Allahdan qeyrisinə dua etmək və ya ölülərdən və ya cinlərdən Allahdan qorxduğu kimi qorxmaq. Müşriklər: - biz bunu Allaha yaxınlaşmaq üçün edirik – deyir:*

***«Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edəndərdir!" – deyirlər. De: "Allaha göylərdə və yerdə** (Özünə şərik)*

***bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah Özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır!"»*** *(Yunus: 18).*

***2)*** *<u>Kiçik şirk.</u> Bu şirk insanı islamdan çıxarmaz, amma onun tovhidini zəiflədir. Bu şirk böyük şirkə aparır və iki qismdir:*

*1 – Zahiri. Bu şirk sözdə və əməldə olur. Sözdə olmasına misal olaraq Allahdan qeyrisinə and içmək. Peyğəmbər (s.ə.s.) deyib: «Allahdan qeyrisinə and içən küfr və ya şirk etmiş olur» (ət-Tirmizi və əl-Hakim).*

*Başqa bir hədisdə isə: «Bir kişi peyğəmbərə: «Allah və sən istəsən», - dedi. Peyğəmbər (s.ə.s.) ona dedi: «Məni Allaha şərik etdin. De ki, təkcə Allah istəsə» (ən-Nəsai).*

*Bu hədisdən görünür ki, düzgün demək belə olardı: Allah və sonra sən istəsən. Və bu da yalnız onun sağ olarkən deməsi düz olardı. Çünki Allah-təala buyurur:*

***«Aləmlərin Rəbi olan Allah istəməsə siz istəyə bilməzsiniz!»*** *(ət-Təkvir: 29).*

*Əməldə olan şirkə misal olaraq, boynuna və ya qola bir şey və ya əski bağlamaq və fikirləşmək ki, bunlar bəladan qoruyur, kömək edir, bir şey hasil edir. Belə etmək olmaz. Belə etiqad edən kiçik şirk etmiş olur.*

*2- Xəfif (gizli) şirk. Bu şirk niyyət və ifadədə olur. Məsələn, riya kimi. Bu işi gördüyün zaman onu Allah üçün yox insanların tərifini qazanmaq üçün etmək. Riya hər hansı bir əmələ qarışsa, onu batil edir. Allah-təala buyurur:*

***«…Kim Rəbbi ilə qarşılaşacağına ümid bəsləyirsə, yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətə heç kəsi şərik qoşmasın»*** *(əl-Kəhf: 110).*

*Peyğəmbər (s.ə.s.) deyir: «Sizdən ötrü qorxduğum şey kiçik şirkdir. Dedilər: «Ya Rəsulullah, kiçik şirk hansıdır?» Dedi: «Riya etmək» (Əhməd, Təbərani).*

*Buraya həmçinin dünya əcri üçün edilən əməllər də daxildir. Məsələn, həcc edir və ya azan verir ki, insanlar onu təriflәsin, və ya cihad edir ki, mal əldə etsin. Belə etmək olmaz. Çünki, bu barədə peyğəmbər (s.ə.s.) bizə belə xəbər verib. O, (s.ə.s.) demişdir: «Dinar-dirhəmin (qızıl-gümüş), xəz-məxmərin (pal-paltar, zinət) qulu olan insan gün görməsin. Beləsinin istədiyini verəndə razı qalar, verməyəndə qəzəblənər» (əl-Buxari).*

*İbn əl-Qeyyim deyib: «Amma iradda və niyyətdə şirk etmək sahilsiz bir dəniz kimidir. De ki, kim qurtular bundan?».*

*Kim ki, öz elmini Allah yolunda yox, başqası üçün edər və bunu Allaha yaxınlaşmaq üçün etməz, lakin*

*savabını Allahdan istərsə, o iradə və niyyətdə şirk etmiş olur.*

*Buna görə lazımdır ki, bütün əməllər yalnız Allah rizası üçün olsun. Bu İbrahimin yoludur. Bu yolu tutmağı Allah bütün insanlara əmr edib. Və kim bu yoldan, bu dindən başqa yol, din ardınca gedərsə, o din ondan qəbul olunmaz. Bu İslamın həqiqətidir. Allah-təala buyurur:*

***«Kim islamdan başqa bir din ardınca gedərsə, heç vaxt qəbul olunmaz və o, axirətdə zərər çəkənlərdən olar!»*** *(Ali-İmran: 85).*

*Və kim bu dini istəməzsə onda o, səfehlərdəndir.*

***Böyük və kiçik şirkin fərqləri:***

*1 – Böyük şirk insanı islamdan çıxarır, kiçik şirk isə çıxarmır.*

*2 – Böyük şirk öz sahibini daimi olaraq cəhənnəmdə saxlayır, kiçik şirk isə əbədi saxlamır.*

*3 – Böyük şirk bütün əməllri batil edir, kiçik şirk isə yalnız onun qarışdığı əməli batil edir.*

*4 – Böyük şirk edənin canı və malı halaldır, kiçik şirk edənin isə canı və malı halal deyil.*

## ***KÜFR: Tərifi və növləri***

***Tərifi:*** *Küfr şəriət anlamında imanın ziddidir. Küfr Allaha və peyğəmbərə imanı inkar etməkdir.*

***Növləri:*** *Küfrün iki növü var: böyük və kiçik küfr.*

***1) Böyük küfr.*** *Bu küfr insanı islamdan çıxarır və o beş qismidir.*

*- Yalan küfrü. Buna dəlil Allah-təalanın kəlamıdır:*

***«Allaha qarşı yalan uydurub düzəldən, özünə haqq gəldikdə onu təkzib edən kəsdən daha zalim kim ola bilər?! Məgər kafirlər üçün cəhənnəmdə yer yoxdur?!»*** *(əl-Ənkəbut: 68).*

*– İmtina və təkəbbür küfrü. Allah–təala buyurur:*

***«Biz mələklərə: "Adəmə səcdə edin! -dedikdə, İblisdən başqa*** *(hamısı)* ***səcdə etdi. O təkəbbürlük edərək imtina etdi və kafirlərdən oldu»*** *(əl-Bəqərə: 34).*

*– Şəkk küfrü. Bu zənn etməkdir. Allah-təala buyurur:*

***«O özünə zülm etdiyi halda bağına girib dedi: "Bu bağın nə vaxtsa yox olacağını güman etmirəm. Qiyamətin də qopacağını zənn etmirəm. Əgər Rəbbimin hüzuruna qaytarılsam, özümə bundan da yaxşı bir məskən taparam!". Onunla söhbət edən yoldaşı belə dedi: "Əvvəlcə səni torpaqdan, sonra bir***

***qətrə sudan yaratmış, daha sonra səni adam şəklinə salmış Allahı inkarmı edirsən? Lakin O, Allah mənim Rəbbimdir və mən heç kəsi Ona şərik qoşmaram!"»*** *(əl-Kəhf: 35-38).*

*– Üz döndərmək küfrü. Allah-təala buyurur:* ***«Kafirlər qorxduqları şeylərdən üz döndərirlər»*** *(əl-Əhqaf: 3).*

*- İkiüzlülük kfrü. Allah-təala buyurur:*

***«Bunun səbəbi odur ki, onlar*** *(dildə)* ***iman gətirdilər, sonra isə*** *(yrəklərində gizli)* ***kafir oldular. Buna görə də onların ürəklərinə möhür vurulmuş, özləri isə anlamaz kimsələr olmuşlar»*** *(əl-Münafiqun: 3).*

***2) Kiçik küfr.*** *Bu küfr insanı islamdan çıxarmır və bu küfr əməldə olur. Bu o günahlardır ki, Quran və Sünnədə küfr adlandırılır. Məsələn, nemətlərə küfr etmək. Allah-təala buyurur:*

***«Allah bir şəhəri misal gətirir. O şəhər əmin-amanlıq və arxayınçılıq içində idi, ruzisi də hər yerdən bol-bol gəlirdi. Lakin*** *(əhalisi)* ***Allahın nemətini inkar etdi…»*** *(ən-Nəhl: 112).*

*Və yaxud başqa misal: müsəlmanları öldürmək haqqında. Peyğəmbər (s.ə.s) buyurur: «Müsəlmanı söymək münafiqlikdir, onu öldürmək isə - küfr» (əl-Buxari və Müslim).*

*- Allahdan qeyrisinə and içmək. Peyğəmbər (s.ə.s.) buyurub: «Kim Allahdan qeyrisinə and içərsə kufr və ya şirk etmiş olur» (ət-tirmizi və əl-Hakim).*

*Allah-təala buyurur:*

***«Ey iman gətirənlər öldürülən şəxsdən ötrü sizin üçün qisas almaq hökmu qərara alındı…»*** *(əl-Bəqərə: 178).*

*Əgər qatil iman gətirən kimdirsə, onda, o, öldürdüyü şəxsin qisas alan vəlisinin (yəni ölənin atası və ya qardaşı) qardaşıdır, baxmayaraq ki, onun qohumunu öldürüb. O, istəsə qatili bağışlaya bilər.*

*Allah-təala buyurur:*

***«****(Öldürən şəxsin)* ***qardaşı tərəfindən bağışlanmış qatil ilə adətə görə*** *(yaxşı)* ***rəftar edilməlidir…»*** *(əl-Bəqərə: 178).*

***«Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları dərhal barışdırın…»*** *(əl-Hucurat: 9).*

*Allah-təala başqa bir ayədə buyurur:*

***«Həqiqətən, möminlər qardaşdırlar. Buna görə də iki qardaşınızın arasını düzəldin…»*** *(əl-Hucurat: 10).*

***Böyük və kiçik küfrun fərqləri:***

*1 – Böyük kürf insanı İtslamdan çıxarır və bütün əməlləri batil edir. Kiçik küfr isə insanı islamdan çıxarmır və əməlləri batil etmir, yalnız etdiyi bu əmələ görə cavab verəcək.*

*2 – Böyük küfr öz sahibini əbədi cəhənnəmə salır, kiçik küfr edən isə cəhənnəmdə əbədi olmur.*

*3 – Böyük küfr edənin canı və malını almağa icazə verilir. Kiçik küfr edənin canı və malını almağa icazə verilmir.*

*4 – Böyük küfr edən müsəlmanların düşmənidir. Onu sevmək, onunla dostluq etmək olmaz, hətta yaxın qohumlardan olsa belə. Kiçik küfr edən isə düşmən deyil, lakin onunla müsəlman arasında müəyyən sərhəd qoyulmalıdır və çalışmaq lazımdır ki, onu dəvət edib doğru yola qaytaraq.*

*Redaktordan: Qeyd edək ki, şirk və küfrün böyüyü ilə kiçiyi arasındakı fərqlərdəki məsələlərdə söylənilən fikirləri icra etmək islam qanunları ilə idarə olunan zaman tətbiqi mümkündür və bu həmin dövlətin səlahiyyətindədir.*